# Nitqin münasibliyi

Nitqin münasibliyi üçün misallar və sitatlar elə seçilməlidir ki, konkret dil situasiyalarının, ədəbi üslubların, zəruri söz və ifadələrin işlədilmə qanunauyğunluğu nəzərə alınsın. Ünsiyyətin müxtəlif sahələrinə xidmət edən funksional üslubların hər birinin özünəməxsus dil materialını seçmə və işlətmə üsulları vardır. Bədii yazıda dil elementlərinin uyğunluğu digər yazı növlərindən fərqlənir. Bədii əsərdə yazıçı janrdan asılı olaraq yaratdığı obrazları dövrün həyat normalarını gözləməklə bədii ifadə və təsvir vasitələri ilə qələmə alır, xalqın sosial həyat şəraitini yeri gəldikcə frazeologizmlərlə, atalar sözləri və zərb-məsəllərlə, şifahi xalq ədə- biyyatı nümunələri ilə zənginləşdirir, əxlaqi-psixoloji faktorları ön planda bədii sözün qüdrəti ilə nümayiş etdirir, insanlarda kiməsə nifrət, kiməsə məhəbbət hissi ilə dolu əsl sənət nümunələri yaradır. Bu üslubda elmi terminlərə, hər növ neologizmlərə, dilin təmizliyini pozan yad-yabançı sözlərə, şablon, trafaret fikirlərə az rast gəlirik. Amma işgüzar (rəsmi-kargüzarlıq, rəsmi-əməli) yazı növlərində standart formalar üstünlük təşkil edir. Bunlar rəsmi sənədlərin pozulmaz forması kimi sabitliyini saxlayır. Nitq mübadiləsinin informasiya məqsədinə xidmət etməsi üçün natiqdən dil strukturuna bələdlik və savad, dilin ifadə vasitələrindən istifadə bacarığı, nitq vərdişi, materialın məzmunu və həcmi haqqında aydın təsəvvür, dinləyici və ya oxucuya veriləcək məlumatın zəruriliyi tələb olunur. Bu zaman nitqin ünsiyyət mühitinə uyğunluğu, dinləyən və ya oxuyanların anlama səviyyəsinə müvafiqliyi nəzərdə saxlanılır. Nitqin münasibliyini şərtləndirən amillər içərisində aşağıdakılar daha önəmlidir:

1) Mövzunun (fikrin) məzmununa uyğun dil materialının seçilməsi;

2) Dil vasitələrinin nitqin məqam və şəraitinə uyğunluğu;

3) Nitq üslubundan asılı olaraq dil vasitələrinin məqsədəuyğunluğu;

4) Dil materialının natiqin şəxsiyyətinə, yaşına, savadına, dünyagörüşünə, sənətinə uyğunluğu

Nitq prosesində kimin kimlə, hansı şəraitdə (təklikdə, yoxsa auditoriya qarşısında, ya da ekran və ya efir vasitəsilə) informasiya mübadiləsi aparması gözlənilməli, nitqin məzmunu, məqsədi, istiqaməti aydın olmalı, natiqin (müəllimin, lektorun, mühazirəçi, məruzəçi və ya çıxış edənin) nəzəri və praktik hazırlığı iştirak edənlərin, dinləyən və ya oxuyanların marağı dairəsində olmalıdır. İctimai yerlərdə dövlət əleyhinə müəyyən sirləri danışmaq, dövlət kəşfiyyat işlərindəki müəyyən məlumatları açıqlamaq olmaz. Hərbi hissələrin nömrəsini, yerini bildirmək də bu qəbildəndir. Buna görə də "N" hərfi ilə hissəyə işarə edilir.

Nitqdə münasiblik yaratmaq üçün tabu və evfemizmlərdən də istifadə olunur. Tabu ictimai yerlərdə qadağan edilmiş yaxud ədəbsiz sayıldığına görə işlənməsi münasib olmayan, kobud, yasaq, ictimai qınaq məzmunlu, əksəriyyəti qadağan olunmuş söz və ifadələrdir. Məsələn, əski inama görə yeni doğulan uşağı şər qüvvələrdən, pis nəfslərdən qorumaq üçün adını qoyanda qulağına pıçıldayır, rəsmi adını ailə üzvlərindən başqa heç kəsə bildirmirdlər. Təkcə uşaqların yox, evin qadının, kişisinin adını çəkmək də yasaq olmuşdur, bu ənənə indi də qalmaqdadır: arvad əvəzinə *uşaqların anası*, *ömür-gün yoldaşı*, kişi, ər əvəzinə *uşaqların atası, evin sahibi, həyat yoldaşım,* oğul, qız əvəzi övladlar *gədə, nökəriniz, qulluqçunuz, evdəkilər* ifadələri ilə evfemizləşdirilir. Cəmiyyətdə həmişə bu və ya başqa bir hərəkət, davranış yasaq sayılmışdır, insanın mənəvi-etik normalrı əxlaq-tabu anlayışları ilə sıx bağlıdır.

Tabular müxtəlif şərait və məqamda işlədilir, evfemizmlər isə bu xoşagəlməz sözü mədəniləşdirmək, yüngülləşdirmək, yumşaltmaq məqsədi daşıyırlar:

Ölmək – *dünyasını dəyişmək, ömrünü bağışlamaq, həyatdan köçmək, gözlərini əbədi yummaq, rəhmətə getmək, keçinmək; vəfat etmək, işıqlı dünyadan ayrılmaq, əcəl yeli əsmək, axirət sarayına getmək, can quşu uçmaq, artıq həyatda yoxdur, haq dünyasına qovuşmaq, çıraq kimi sönmək, gözlərini əbədi yummaq*;

Ağlamaq – *gözünün qorasını tökmək, gözünün qorasını sıxmaq, gözündən yş tökmək;*

Xəstələnmək – *halı pisləşmək, əhvalı pozulmaq, özünü pis hiss etmək;*

Qocalmaq – *saqqalına dən düşmək, ağacı əlindən düşmək, saqqalı ağarmaq, beli bükülmək;*

Evlənmək – *ayağı bağlanmaq, əl-ayağı yığılmaq, kəndirlənmək*;

Ac qalmaq – *ağzı möhürlü oturmaq;*

Kasblamaq – *cibində siçanlar oynamaq*;

Hürmək – *ağzını göyə tutmaq*;

Oğru - *əliəyri, iki ayaqlı pişik*;

Dəli olmaq – *başına hava gəlmək, havalanmaq, ağlını itirmək;*

Kor olmaq – *gözünə ağ gəlmək;*

Kar olmaq – *qulaqları ağır eşitmək, qulaqlarında küy olmaq;*

Söyüşçül adam – *ağzıgöyçək;*

Sərxoş – *lülatəş, lülqənbər, kefi yüz vurmaq, ceyran suyu;*

İnsanda olan fiziki qüsur, məsələn, pəltək – *dilişirin və s.*

# Nitqin rabitəliliyi

Nitq prosesində əgər sözlər yerli-yerindədirsə, cümlələr düzgün qurulmuşsa, mövzu rabitəli, əlaqəli şəkildə şərh olunursa, deməli, informasiya verən ifadə etdiyi fikri yaxşı bilir, onun mahiyyətini hərtərəfli dərk edir. Belə vaxt hadisənin, faktın izah olunma ardıcıllığı məntiqə əsaslanır. Ümumiyyətlə, ardıcıllıqla şərh olunan material yaxşı anlaşılır, mənimsənilir. Bunun üçün materialın əsas və ikinci

dərəcəli məsələləri bir-birindən ustalıqla ayrılmalı, ikinci dərəcəlilərin üzərində çox durmayıb əsas məsələnin izahına keçmək vacibdir. Natiq əsas məsələnin üzərində xüsusi dayanmaqla onun mahiyyətini öz sözləri, düşüncəsi və üslubu ilə rabitəli ifadə etməlidir.

Nitqin rabitəliliyi üçün aşağıdakılara əməl edilməlidir:

1. Nitq məzmunca dolğun olmalıdır. Bunun üçün natiq nitqin predmetini – haqqında danışacağı (və ya yazacağı) əşyanı, hadisəni, əhvalatı və sairəni yaxşı mənimsəməli, onun mahiyyətini hərtərəfli dərk etməlidir. Əgər şərhçi beynəlxalq aləmdə baş verən hadisəni, onu doğuran səbəbləri özü yaxşı bilmir, aydın təsəvvür etmirsə, həmin hadisənin nə ilə nəticələnəcəyi proqnozunu verə bilmirsə onun söhbəti, şübhəsiz ki, dinləyici üçün qənaətləndirici ola bilməz.

2. Hər hansı bir məsələ barəsində danışılarkən (və ya yazılarkən) müəyyən məntiqi ardıcıllığa riayət olunmalıdır.

3. Danışan (yazan) əsas və ikinci dərəcəli məsələləri bir-birindən ayırmağı bacarmalıdır. Natiq şərhində əsas məsələ üzərində xüsusi dayanmalı, söhbətin mahiyyətini dinləyiciyə çatdırmalıdır. Onun nəzərində tutduğu məsələdə ikinci dərəcəli fikirlər əsas fikrin izahına, anlaşılmasına kömək etməlidir. Amma bəzən nitqdə bu tələb gözlənilmir. Danışan mövzuda az əhəmiyyətli məsələlər üzərində daha çox dayanır, uzunçuluğa yol verir ki, belə nitqdə fikir zəif və natamam ifadə olunur. Əsas fikri çatdıra bilməyən natiqin nitqi, şərhi maraqsız olur, dinləyici belə söhbətdən tez can qurtarmağa çalışır.

4. Natiq öz sözü, cümləsi, düşüncəsi, üslubu ilə danışmalıdır. Özgə dili ilə, hazır cümlələrlə danışmaq nitqin keyfiyyətini aşağı salır, onu canlılıqdan məhrum edir. Natiq məlum olanları şərh etdikdə belə onları öz dili – ifadə tərzi ilə daha bitkin, daha maraqlı bir formada dinləyicilərə çatdırmağı bacarmalıdır